UOT 619:61.995.1

# GÖYƏRÇİNLƏRİN SAXLANMA ŞƏRAİTİNƏ, BƏSLƏNMƏSİNƏ DAİR BAYTAR-SANİTAR TƏLƏBLƏR VƏ ONLARDA TƏSADÜF OLUNAN XƏSTƏLİKLƏRƏ QARŞI MÜBARİZƏ TƏDBİRLƏRİ

**A.R.ƏSGƏROV, M.S.MİKAYILOV, N.G.QULİYEV, M.C.HƏSƏNOVA, E.E.AXUNDOV**
**AKTN Baytarlıq Elmi Tədqiqat İnstitutu**

*Göyərçinlərin cinsləri, saxlanma şəraiti, yemlənməsi, optimal rasionu haqda məlumat verilmişdir.*
*Müxtəlif vitaminlərin çatışmazlığı nəticəsində əmələ gələn və infeksion xəstəliklər, onların müalicə və profilaktikası haqda qısa məlumat verilmişdir.*
*Məqalə əsas etibarilə göyərçin saxlayanlar üçün məlumat xarakteri daşıyır.*
***Açar sözlər:****Göyərçin, cins, terapevtik-infeksion xəstəliklər, müalicə- profilaktika.*

Göyərçinlərin insanlar tərəfindən əhlilləşdirilməsi çox qədim zamanlara təsadüf edilir. Hazırda yayılan müxtəlif cins göyərçinlərin əcdadı vəhşi çöl göyərçinləri hesab edilir.

Göyərçinlərin fərqli xüsusiyyətləri onların xarici mühitə uyğunlaşmaları, sülhsevərlikləri, müəyyən arealda yaşamaları və tez əhlilləşmələridir.

Dünyada orta hesabla 300-ə qədər göyərçin cinsi vardır ki, onların miqdarı yeni cinslərin yetişdirilməsi və mövcud cinslərin itməsi ilə dəyişə bilər.

Göyərçinlərlə təmasda olmaq insanlarda əhval-ruhiyyəni yaxşılaşıdırır, yorğunluğu azaldır, uşaqlarda isə təbiətə mərhəmətli olmağı aşılayır.

Yetişdirilmiş cins göyərçinləri funksional təyinatına görə şərti olaraq aşağıdakı qruplara bölmək olar;

Rabitəçi-uçaraq öz yerinə qayıtmaq instinkti, sürətlə uçan forması ilə fərqlənirlər;

Dekorativ-tük örtüklərinin rənginə, bədənlərinin quruluşuna və lələklərinin quruluşuna görə fərqlənirlər.

Göyərçinlərin çəkisi onların yaşından, cinsindən, cinsiyyətindən və yemləmə şəraitindən asılıdır. Diri çəki quşlarda 200,0-1000,0 qrama qədər olur. Yaşlı göyərçinlərin fizioloji göstəriciləri aşağıdakı kimidir:

| Bədənin rektal temperaturu | Ürəyin 1 dəqiqədə pulsu | Tənəffüs hərəkətləri | Eritrositlərin miqdarı min/sm$^3$ | Leykositlərin miqdarı min/sm$^3$ | Hemoqlabin % | Yetişkənlik. ay | Cücəçıxması müddəti. gün |
|---|---|---|---|---|---|---|---|
| 40,6-42 | 140-400 | 25-30 | 3,5-4,0 | 13-18,5 | 15-16 | 6-7 | 17-21 |

Göyərçinlərdən sağlam cücə almaq üçün inkubasiya yumurtaları aşağıdakı göstəricilərə malik olmalıdır; çəkisi 14-24 qram, hava kamerasının diametri 1,5 mm-dən az, qabığın qalınlığı 0,2-0,25mm; vitamin-karatinoidlərinin cəmi 18 mkq/q, D vitamininin miqdarı 7mkq/q, $B_{12}$ vitamini 5mkq/q aşağı olmamalıdır!

**Göyərçinlərin xəstəlikləri**

Xəstə göyərçinləri sağlamlardan aşağıdakı əlamətlərinə görə fərqləndirmək olar; xəstə göyərçinlərin davranışları fərqli olur. Onlar uçmaq qabiliyyətini itirirlər, xarici mühitə reaksiyaları zəifləyir, yemdən imtina edirlər. Quş yuvada büzüşmüş halda biganə oturur, tükləri pırpızlaşmış, gözləri yarıaçıq, başını irəli uzatmış halda, bəzən başını, ayağını silkələyir, qıcolma halları, ifrazat prosesinin tez-tez baş verməsi nəzərə çarpır.

Bəzi hallarda xəstəlik əlamətləri az hiss olunsa da, lakin qanadlarının düşməsi, qanadlarının və ayaqlarının titrəməsi, boynunun əyilməsi daha çox nəzərə çarpır. Hərarətin qalxması quyruğun tez-tez qalxıb enməsilə nəzərə çarpır, dimdiyi açıq olur. Xəstə göyərçin adətən insanların hərəkətinə reaksiya vermir, ona görə də onları tutmaq asan olur. Xəstə quşu asanlıqla tutub göz bəbəklərini, gözətrafı sahələri, burun deşiklərindən ifrazatın gəlməsini, eyni zamanda qulaqdan ifrazatın gəlməsini, iltihab əlamətini, gənə və digər parazitlərin olmasını yoxlamaq vacibdir. Ağız boşluğu, boyun nahiyyəsi, döş hissəsi, udlağı, çinədən və s. şəhadət və baş barmaqla müayinə edilir.

İnfeksion xəstəliklərin çoxunda bədənin hərarəti yüksəlir, onu yoxlamaq üçün qanadın altına termometr qoyulur. Həkim və ya quşa baxan ürəyin, ağciyərin fəaliyyətini yoxlamaq üçün göyərçini qulağına söykəyir və ürəyin döyüntüsünü, ağciyərdə olan xırıltını eşitmək olur.

Bəzi xəstəliklərin kliniki əlamətləri-

Rinit-nəfəs yollarının iltihabı olub, burun nahiyyəsindən kleyə bənzər maye çıxır. Burun deşiyinin tam bağlanması zamanı göyərçin ağzı açıq nəfəs alır. Sinusit-gözaltı nahiyyənin iltihabıdır. Belə hallarda gözaltı boşluq eksudatla dolu olur.

Konyuktivit-göz qapağının iltihabı nəticəsində qapaqlar bir-birinə yapışır. Stomatit-ağız boşluğunun selik qişasının iltihabı nəticəsində yapışqanlı eksudat və pərdə əmələ gəlir. Otit- eşitmə yolu iltihab nəticəsində tam bağlanır. Traxeit-traxeyanın selik qişasının iltihabı və nəfəs yolunun tutulması nəticəsində göyərçin dimdiyi açıq halda nəfəs alır.

Qastroenterit-mədənin və bağırsağın selik qişasının iltihabı nəticəsində sulu, həlməşikli, bəzən qan qarışığı ilə, yaşıl rəngdə zil ifraz olunur. Belə hallarda xəstə quşlar büzüşmüş, gözləri yarımaçıq halda, onların nəfəsalması və ürəkdöyünməsi tezləşir, yemə gəlmir, hərarət yüksək olur.

Mədə-bağırsaq pozğunluğu müxtəlif keçici xəstəliklərin-paratif, kolibakterioz, tuberkulyoz, çiçək, koksidioz, trixomonoz, zəhərlənmə və helmintozların nəticəsində də baş verir. Belə hallarda xəstəliyin səbəbini dəqiqləşdirərək həmin xəstəliyə qarşı müalicə aparılmalıdır.

Artirit-ayaq və qanad oynaqlarının iltihabı nəticəsində şişkinləşir, bəzən qan sığıntısı və eksudat müşahidə olunur.

Parez, paralic-sinirlərin iltihabı nəticəsində qanad sallanır, ayaq üstdə qeyri-təbii dayanması, başın və boyunun əyilməsi baş verir.

Dermatit-dəri nahiyyəsinin iltihabı, qabıq verməsi, lələklərin tökülməsidir.

Anterioz-dəri nahiyyəsində tükün olmamasıdır. Göyərçinlərin karantində saxlanması, kənardan alınan göyərçinləri infeksiyadan qorumaq üçün və uzun müddət kənara uçub sonra qayıdan quşları 1 ay müddətində karantində saxlamaq lazımdır. Karantin otağı yaxşı olar ki, başqa yerdə izolyasiya edilmiş olsun. Həmin otaqda xəstəliyə şübhəli quşların həm ümumi kliniki vəziyyəti, yem-su qəbulu, inkişafı, tüklənmə prosesi müşahidə olunur. Xəstəliyə şübhə yarandıqda xüsusi tədqiqat aparılır, lazım gələrsə qan seroloji yoxlanılır.

Xəstə quşlara ilk yardım. Xəstəlik baş verdikdə diaqnoz dəqiqləşənə kimi simptomatik müalicə aparılmalıdır; tünd çayla, marqans məhlulu ilə, rivanolla yaxud furosilinlə dimdiyi, ağız boşluğunu yumaq lazımdır. Xarici yaraları yod məhlulu ilə işləmək, qərtməkləri borlu mazla yağlamaq olar. Güclü bağırsaq pozğunluğunda anus dəliyinin ətrafı çirklənmiş tüklərdən təmizlənməli və bitki yağları ilə silinməlidir.

İnfeksiya xarakterli xəstəliklər aşkar edildikdə quşu mütləq baytar məntəqəsinə aparmaq və quşlarda xüsusi müalicə kursu aparılmalıdır. Göyərçinlərin içdiyi suya mütəmadi olaraq dezinfeksiyaedici prepartlar əlavə olunmalıdır. Xəstəlik baş verdikdə quş damı və inventarlar təmizlənib dezinfeksiya edilməlidir.

Müalicəvi preparatların göyərçinlərə verilməsi yolları. Müalicənin effektliyi dərmanların xəstə quşlara düzgün verilməsindən çox asılıdır. Çinədanda və mədə-bağırsaq xəstəliklərində adətən pipetka və ya zonddan istifadə olunur. Belə hallarda quşu arxası üstdə tutmaq lazım deyil ki, məhlul nəfəs yoluna düşsün.

Dərman maddələrini həb şəklində verdikdə xəmirlə və ya çörəklə qarışdırıb ağız boşluğuna ötürülür.

İnfeksion xarakterli xəstəliklərdə intensiv müalicə məqsədilə dərialtı və əzələdaxili müalicə üsullarından istifadə olunur. Bu məqsədlə quşun döş hissəsinin tükü aralanır, spirtlə, yod məhlulu, odekalon və s dezinfeksiya edilir, preparat iynə vasitəsilə əzələnin qalın hissəsinə baş nahiyyəsi istiqamətində bir sm dərinliyində yeridilir.

Dərialtı üsulda isə boyun nahiyyəsinə başdan bədənə doğru dərman yeridilir.

Müalicə preparatları su vasitəsilə verilərkən axşamdan su kəsilməlidir ki, səhər dərmanlı suyun çoxunu quş içə bilsin.

Toz halında dərman verilərkən dənli bitkilər əvvəlcə bitki yağları ilə isladılmalıdır ki, preparat yemin üzərinə yapışsın.

Ayrı-ayrı infeksion xəstəliklərin qarşısını almaq məqsədilə vaksinasiyadan istifadə olunur.

Göyərçinlərin saxlanmasında su və yem istifadəsində baytar-sanitar qaydalara əməl olunmalıdır.

Göyərçinlər tövlə şəraitinə o qədər həssas olmasalar da quş damları müəyyən tələblərə cavab verməlidir.

Yaxşı olar ki, quşlar qrup halında-25-30 baş bir damda bəslənilsin. Quşun sayı nə qədər az olarsa xəstəliklə yoluxma ehtimalı bir o qədər az olar. Göyərçinlərin gəzməsi və sərbəst hərəkət etməsi üçün hər quşa $0,5 m^2$ sahə və $1\ m^3$ hava mühiti olmalıdır ki, belə şəraiti qəfəs halında düzəldirlər.

Qəfəs elə düzəldilməlidir ki, onun içərisinə it, pişik, siçovul, siçan və s. daxil ola bilməsin. Qəfəsin döşəməsi yaxşı olar ki, sement və betonla örtülmüş olsun. Quşlar təmiz içməli su ilə təmin olunmalıdır. Müxtəlif xəstəliklərdən qorunmaq üçün 10 litr suya 1 ml hesabı ilə formalin yaxud xlorlu əhəng əlavə edilir.

Dezinfeksiyaedici preparatlar 4-5 gün əlavə edilir, 10 gün təmiz su verilir. Bu minvalla həm profilaktik tədbir aparılır, həm də göyərçinlərin sudan imtina etməsinin qarşısı alınır.

Yemləmə prosesində də yem qabları sanitar cəhətdən təmiz olmalıdır və elə yerləşdirilməlidir ki, quşlar ayaqları ilə içərisinə daxil olub çirkləndirməsinlər. Yem qabları gündəlik təmizlənməli, həftədə bir dəfə dezinfeksiya olunmalıdır.

Göyərçinlərin saxlanması və nəsil alınması üçün temperatur rejimininndə böyük əhəmiyyəti var. Optimal temperatur onlar üçün müsbət 25 dərəcə hesab olunur. Aşağı temperatur quşların həyat

fəaliyyətini zəiflədir, immunitet aşağı düşür və nəticədə quşlar xəsstəliyə məruz qalır. Yüksək temperatur da quşlar üçün əlverişsizdir. Xüsusən yay aylarında balalar daha çox əziyyət çəkir. Ona görə də göyərçin bəsləyənlər yeni nəsil quş yetişdirməyi mart-aprel aylarına nəzərdə tutmalıdırlar. Nəzərə almaq lazımdır ki, infeksion xarakterli xəstə quşlar ətraf mühitə xəstəliyin törədicilərini yayır və sağlam quşları yoluxdura bilər. Ona görə də mütləq ayrı-ayrı xəsətliklərə qarşı müəyyən dezinfeksiya maddələri işlətmək lazımdır. Bu məqsədlə 1-2 %-li natrium qələvisi, 3-4%-li xlorlu əhəng, 3-4 %-li xloramin, 1%-li formalin və s. məhlulu işlədilir.

Dezinfeksiya profilaktiki və məcburi aparılır. Profilaktiki dezinfeksiya ayda bir dəfə, məcburi isə xəstəlik baş verdikdə 4-5 gündən bir aparılır. Bunun üçün quş damı, inventarlar qabaqcadan təmizlənib yuyulur. Ən yaxşı dezinfeksiya yandırma üsulu hesab olunur.

Göyərçinlərin yemlənməsinin öz xüsusiyyəti vardır. Hər şeydən əvvəl quşa verilən yem yüngül həzm olunmalıdır, kənar qarışıqlar olmamalıdır. Kif göbələklərindən, həşəratlardan təmiz olmalıdır. Yemlər eyni zamanda gəmiricilərdən qorunmalıdır. Göyərçinlərin diri çəkisindən asılı olaraq gündəlik yemə tələbat hər gün üçün 20-50 qram təşkil edir. Gündəlik yemin tərkibi təxminən darı-40%, buğda-10%, paxlalılar-40%, günəbaxan və s. 10%-dən ibarətdir. Quşun sağlam inkişafı üçün yemin tərkibinə mineral maddələr əlavə olunmalıdır. Faiz nisbətinə görə bu maddələrin tərkibində sümük unu30%, kalsium fosfor duzu 50%, mineral maddələr 1,5% ( marqanis, dəmir, mis6:1:0,3 nisbətində), yodlaşdırılmş duz 13,5% olmalıdır. Qarışiq yemlə yaxud 1 litrə 2 qr olmaqla su ilə verilməlidir.

Quşların həyat fəaliyyəti üçün çınqılın da böyük əhəmiyyəti vardır. Əzələli mədədə cınqılın olmasinin bir neçə əhəmiyyəti vardir. Çınqılın əzələli mədədə olması yemin orqanizm tərəfindən mənimsənilməsini sürətləndirməklə bərabər quşun ümumi inkişafına da təsir edir.

Çınqılın mədədə olmaması sonuncunun zədələnməsinə goyərçinin isə xəstəliyinə səbəb olur. Təbaşir və balıqqulağı çınqılı əvəz edə bilməz.

**Göyərçinlərdə terapevtiki xəstəliklər.**

Vitamin çatışmazlıqları xəstəliklərdən A vitamini (retinol) - orqanizmdə burun boşlugunun , gözün buynuz qişasının, nəfəs yolunun və s. selik qişası epiteliyasının müqavimətinin artırılmasına xidmət edir. Həmin vitaminin çatışmazlığı göstərilən orqanların iltihabına səbəb olur. Göyərçinlərin A vitamininə tələbatnı yonca unu ilə təmin etmək olur. A vitamini tək halda və başqa vitaminlərlə birlikdə istehsal olunur.

D vitamini (kalsiyferol) sümüyün bərkiməsinə və onun unkişafına təsir edir. D vitamininin çatışmazlığı raxitə sümüyün boşalmasına (osteamalyasiya) səbəb olur. Həmin vitaminin çatışmazlıgı göyərçinlərdə 14-40 günlüyündə anemiya, inkişafdan qalma , zəif tüklənmə, ayaq sümüklərinin əyilməsi şəklində özünü biruzə verir.

Balıq yağının tərkibində D vitamininin bütün növləri olduğundan müalicə məqsədilə 1 quşa 10 damcı yemlə 10 gün verilir.

E vitamini (tokoferol) orqanizmdə yağ mübadiləsində, əzələ toxumalarının əmələ gəlməsində, normal yumurta əmələ gəlməsində iştirak edir.

Bütün vitaminlər kimi D vitamini də orqanizmin xəstəliklərə müqavimətini yüksəldir.

D vitamini çatışmazlığı ayaqlarda iflic yaradır, hərəkətin kordinasiyasının pozulması, bəzən də sinirlərin oyanması halları baş verir.

Müalicə məqsədilə yağ şəklində E vitamini – tokoferol satılır. Həmin vitamindən 1 damcı dənli bitki ilə verilir. Bundan başqa vitamin yaşıl bitkilərin tərkibində vardır. Vitamin K(filloxinon)-qanın laxtalanmasına kömək edir.

O yaşıl bitkilərin tərkibində olur. Vitamin $B_1$ (tiamin) sinir sisteminin fəaliyyətini və əzələ sistemini, karbohidratların maddələr mübadiləsini tənzimləyir.

$B_1$ vitamininin çatışmazlığı zamanı quşlar iflic olur, əzələ sistemi zəifləyir.

$B_1$ vitamini təmizlənməmiş dənli bitkilərdə və mayada daha çox olur.

$B_2$ (riboflavin) vitamini göyərçinlərin böyüməsinə və inkişafına təsir edir. Daha çox bitkinin qabığında və dənli bitkinin tərkibində olur.

$B_3$ vitamini (niasin)- həmin vitaminin çatışmazlığı oynaqların, burun boşluğunun, dərinin, göz qapaqlarının iltihabına səbəb olur. Orqanizmi $B_3$-lə təmin etmək üçün quşlara taxıl yarması, çəltik qabığı və maya verilir.

Ümumiyyətlə, hər bir canlı orqanizmdə olduğu kimi göyərçinlərində sağlam inkişafında vitaminlərin böyük rolu vardır.

Onların çatışmazlığı müxtəlif terapevtik xəstəliklərə səbəb olur və infeksion xəstəliklərin baş verməsinə zəmin yaradır.

**İnfeksion xəstəliklər**

Çiçək-virus xarakterli olmaqla bütün quşçuluq təsərrüfatlarına böyük ziyan vurur.

Xəstəlik adətən aprel-iyun aylarında yeni nəslin yetişdiyi və göyərçinlərin uzun müddət uçmaq imkanı yaranan dövrdə, digər vəhşi göyərçinlərlə kontaktı zamanı baş verir.

Yaşlı göyərçinlərdə adətən çiçəyin dəri forması, cücələrdə isə ana quş onları yemlədiyi üçün qarışıq forması-dəri və difterik forması müşahidə edilir.

Xəstəliyin mənbəyi adətən xəstə və xəstələnib sağalmış quşlardır. Yoluxma müəyyən avadanlıqlarla, yemlə, su ilə və s. keçir. Xəstəlik hava-damcı yolu ilə keçir.

Göyərçinlərdə çiçək dəri forması kimi keçdikdə gözətrafı şişir, dimdiyin ətrafında qara ziyilə bənzər qalınlaşma əmələ gəlir. Difterik formada isə ağız boşluğunun, burun-udlaq, qırtlaq, çinədanın selik qişasının içərisinə sirayət edən difterik pərdə əmələ gəlir. Bəzən nəfəs yolunda xəstəlik zamanı tıxac əmələ gəlir və quşun nəfəs alması çətinləşir yaxud xırıltılı səs eşidilir:

Xəstəlik qarışıq keçdikdə quşun vəziyyəti ağırlaşır.

Müalicə xəstəliyin başlanğıcında effekt verir. Görünən yaraları 2-3%-li furasilin yaxud 2%-li bor məhlulu ilə silmək olar. Dəridəki yaraları əvvəlcə yod məhlulu ilə yandırıb, sonra hər hansı bir kremlə yağlamaq olar. Mürəkkəbləşmənin qarşısını almaq üçün antibiotiklərdən ampisilin, baytril, gentomisin işlədilir.

Müalicə A vitamini verdikdə yaxşı effekt verir. Ona görə quşun rasionuna yaxşı olar ki, yer kökü, ot unu, balıq yağı, maya əlavə edilsin. İçməli su 0,5% xloraminlə, 1:1000 marqanısla, 1%-li salisil turşusu ilə dezinfeksiya edilir.

Xəstə quşlar mütləq izolyasiya edilir və qapalı şəraitdə saxlanılır. Kliniki sağlam quşlar peyvənd olunur. Xəstə və zəif quşlar peyvənd olunmur.

Xəstəlik baş vermiş damda və onun ətrafında dezinfeksiya işləri aparılmalıdır. Quş damı qabaqcadan təmizlənir, sonra 2%-li kaustik soda və ya 3%-li xlorkrezolla, 1-2%-li formalinlə dezinfeksiya edilir. Ümumiyyətlə xəstəliyin qarşısını almaq üçün ayda bir dəfə damda dezinfeksiya aparılmalıdır. Hər il göyərçinlərdə çiçək baş verirsə cavan quşlar arasında 30 günlüyündə peyvənd aparılır.

Nyukasl xəstəliyi (atipik taun) Xəstəlik virus etiologiyalı olmaqla quşlar arasında geniş yayılmışdır. Göyərçinlərdə qırtlağın, traxeyanın, ağciyərin iltihabı baş verir. Xarakterik xüsusiyyətlərdən bağırsaq pozğunluğu, ətrafların iflicini qeyd etmək olar. Göyərçinlərdə infeksiya toyuqlarla birgə saxlandıqda axırıncıdan yoluxa bilər. Ölüm halları 20-90%-ə çatır. Müalicənin effekti olmadığından əsasən profilaktiki tədbir aparılır. Quşlar təcrid olunaraq başqa növ heyvanlardan və quşlardan ayrı saxlanmalıdır.

Quşların xəstəliklə yoluxma qorxusu olarsa mütləq peyvəndlənmə aparılmalıdır. Peyvəndləmə cavanlara içirtmə, göz damcı üsulu ilə, yaşlı quşlarda isə əzələdaxili infeksiya yolu ilə aparılır.

Paramiksovirus infeksiyası-virus etiologiyalı yüksək keçiciliyə malik və geniş əhatəli olmaqla bəzi hallarda salmonellyozla qarışıq getdiyindən diaqnoz qoymaq çətinləşir. Kliniki əlamətləri xarakterik olmadığından diaqnoz çətinləşir. Əsas əlamət sinir sistemi pozğunluğudur və patoloji materialdan virusun ayrılmasıdır.

Müalicə yalnız qiymətli quşlar arasında aparılır.

Profilaktik tədbirlər Nyukasl xəstəliyindəki kimi aparılır. Peyvəndləmə yalnız şərti patogen quşlar arsında aparılır.

Göyərçinlərin qripi –virus etiologiyalı olmaqla digər növ quşları da yoluxdurur. Xəstə quşlarda mədə-bağırsaq sisteminin pozulması, xəstəlik davam edərkən sinir sistemində də dəyişiklik özünü göstərir.

Onkogen virus xəstəlikləri (retrovirus infeksiyası, sarkomatozlar, leykozlar, quş neoplazmaları). Xəstəliklərə müxtəlif növ quşlar o cümlədən göyərçinlər tutulurlar. Göyərçinlərdə sarkomatoz və leykoz formasında müşahidə olunur. Sarkomatoz şiş formasında adətən xoşxasiyyətli olur. Bəzən bədxasiyyətli forması da müşahidə edilir.

Leykozda isə qara ciyərin, limfanın və müsariqənin şişməsi nəticəsində kəskin arıqlama baş verir və ölümlə nəticələnir.

Ornitoz (xlamidioz) quşlar və heyvanlar arasında geniş yayılan xəstəlikdir. Həmin xəstəlik insanlar arasında da müşahidə olunduğundan antroponoz adlanır. Xüsusilə uşaqlar adətən həyət-bayırda uça bilməyən göyərçini tutub oynadıqları zaman yaxud quş damında xəstə quşlara qulluq etdikdə yoluxa bilər.

Göyərçinlərdə xəstəlik subkliniki və latent formada gedir. Xəstə quşlarda iştah itir, suya hərislik, həzm prosesi pozulur, zılın su kimi olması, dəri səthinin göyərməsi, uçma qabiliyyətinin itməsi, qanad və ayaqların qıc olması müşahidə edilir. Xəstəliyə quşlar bir başa yaxud da çirklənmiş avadanlıqlar vasitəsilə yoluxurlar.

İnfeksiya həşaratlar, gəmiricilər və s vasitəsilə də yayılır.

Xəstəliyi trixomonozdan, mikoplazmozdan, çiçəkdən, aspergilyozdan, salmonelyozdan və s. təfriq etmək lazımdır. Müalicəni başlanğıc stadiyada və qiymətli quşlar arasında aparmaq məqsədə uyğundur.

Müalicə geniş spektrli antibiotiklərlə tetrasiklin, oksitetrasiklin, baytrillə effekt verir.

Profilaktiki tədbirlər digər infeksiyalarda olduğu kimi aparılır.

Salmonelyoz(paratif)-quşlar o cümlədən göyərçinlərdə tez-tez müşahidə edilən infeksion xəstəlikdir. Xəstəlik insanlarda qida zəhərlənmələri kimi qeyd olunur və güclü mədə-bağırsaq pozuntuları kimi özünü biruzə verir. Xəstəliyə əksər növ heyvanlar da tutulurlar. Cavan heyvan və quşlarda daha iti keçir, əksər hallarda ölümlə nəticələnir. Yaşlı quşlarda adətən xroniki keçir. Xəstəliyin başlanğıcında adətən bağırsaqlarda güclü iltihab baş verir və diareya əlamətləri ilə özünü göstərir.Xəstəlik tam xroniki hala keçdikdən sonra oynaqların şişməsi və hərəkətin məhdudlaşdırılması, qanadları ilə hərəkət cəhdi özünü göstərir.

Diaqnoz epizootik situasiyaya, kliniki əlamətlərə, pataloqanatomiki yarmanın və bakterioloji müayinələrin nəticələrinə (kulturanın alınması, seroloji müayinə, spesifik antigenlərlə yoxlama) görə müəyyən edilir. Müalicə tədbirləri antibiotiklərlə və nitrofuran preparatları ilə aparılır. Müalicə 15 gün və daha çox çəkir. Saxlanılan göyərçinlərin əksəriyyətində xəstəlik müşahidə olunursa yaxşı olar ki, bütün dəstə ləğv olunsun, quş damında təlimata uyğun sanasiya işləri aparılsın. Sanasiyadan sonra sexə gətirilən quşlar karantində saxlanılaraq müayinədən keçirilsin. Sonra ümumi sexə buraxılmalıdır.

İnfeksion zökəm (İnfeksion nasmorq) göyərçinlərin burun boşluğunun, gözaltı sinusların, göz konyuktivinin selik qişalarının kataral iltihabı. Xəstəliyi hemofil çöpləri əmələ gətirir, lakin virus və göbələklər də prosesdə iştirak edir.

Göstərilən xəstəliklərdən başqa vərəm, psevdotuberkulez, respirator mikoplazmoz, pasterelyoz, stafilokokkoz, streptokokkoz, kolibakterioz, Göbələklərin törətdikləri mikozlar və mikotaksikozlar, aspergiloz, kondidamikoz kimi infeksiyalara rast gəlinir.

Müxtəlif növ heyvanların və quşların dəri səthində parazitlik edən çoxlu sayda həşaratlar, gənələr, daxili orqanlarında isə helmintlərin törətdikləri xəstəliklər mövcuddur. Məqalədə göstərilən bütün infeksion və invazion xəstəliklərin baş verməsinin əsasını xəstəliyin törədici amili ilə bərabər, birtərəfli yemləmə və baytar-sanitar tədbirlərin yarıtmaz aparılması təşkil edir.

Belə ki, quşları xəstəliklərdən qorumaq üçün infeksiya zəncirini qırmaqla yanaşı yemləmə keyfiyyətli, vitaminlərlə zəngin olmalıdır. Dezinfeksiya və digər profilaktiki tədbirlər vaxtlı-vaxtında və keyfiyyətli aparılmalıdır.

**ƏDƏBİYYAT**

1.Ларионов В.Ф. Разводите голубей М.1956/ 2. Ямов И.Д, Разведение голубей М. 1957 Ларионов В.Ф. Разводите голубей М.1956. 3. Васильев Н.А., Дергач Н.С“Голубеводство” Москва Колос, 1971. 4. Tauben krankheiten – Kurt Vogel und andere. Berlin 1983. 5. Рахманов А.И, Бессарабов Б.Ф. “Голуби и профилактика их заболеваний ”Россельхозиздат 1987. 6.“Технология выращивания и содержания мясных голубей”, методические рекомендации Сергиев Посад 2000

**Ветеринарно-санитарные требования условиям содержания, кормления голубей и меры борьбы к их заболеваниям .**

**А.Р.Аскеров, М.С.Микаилов, Н.Г.Гулиев, М.Ч.Гасанова, Э.Э.Ахундов**

В статье изложены условия содержания и кормления голубей, особенности их жизнеспособности. Вкратце указаны терапевтические и инфекционные заболеваниявстречающиеся у голубей, пути их профилактики и лечения. Также указаны ветеринарно-санитарные правила предохранения голубей от различных недугов. Статья рассчитана на осведомление любителей, занимающихся разведением голубей.

***Ключевые слова:****Голуби, породы, терапевтические и инфекционные заболевания, лечение, профилактика.*

**Veterinary and sanitary requirements for keeping, feeding pigeons and measures to fight their diseases**

**A.R.Askerov, M.S.Mikailov, N.G.Guliyev, M.Ch.Hasanova, E.E.Akhundov**

The article describes the contents and feeding of pigeons, the features of their life activity. Briefly, the therapeutic and infectious diseases encountered in pigeons, the ways of their prevention and treatment. Veterinary and sanitary rules for the protection of pigeons from various ailments are also indicated. The article is intended for the illumination of amateurs engaged in breeding pigeons.

***Key words:*** *Pigeons, breeds, therapeutic-infectious diseases, treatment, prevention.*